UOT: 712.27 (477.75)

# YENİ İNTRODUKSİYA OLUNMUŞ ŞAFTALI SORTLARI

**Z.F.SƏRHƏDOVA**
**AKTN Meyvəçilik və Çayçılıq Elmi Tədqiqat İnstitutu**

*Məqalədə şaftalı bitkisi, onun yayılma arealı və ölkəmizə İspaniyadan 2017-ci ildə introduksiya olunmuş şaftalı və onun nektarin qrupuna aid olan sortları haqqında məlumat, eləcə də həmin sortların pomoloji təsviri verilmişdir.*

***Açar sözlər**: şaftalı bitkisi, şaftalı sortları, intoduksiya olunmuş sortlar, sortların xüsusiyyətləri.*

Respublikamızın torpaq-iqlim şəraitinin rəngarəngliyi burada müxtəlif meyvə bitkilərinin becərilməsi üçün əlverişliliyi ilə seçilir. Təbiətinin zənginliyinə və kənd təsərrüfatının mürəkkəbliyinə görə ölkəmiz dünyada əsas yerlərdən birini tutur. Dünyada mövcud olan meyvə bitkilərinin əksər hissəsi tropik meyvə bitkiləri müstəsnalıq təşkil etməklə, respublikamızın ayrı-ayrı təbii-iqtisadi bölgələrində becərilir. Bu bölgələrdən biri olan Quba-Xaçmaz bölgəsində qədim zamanlardan bəri tumlu və çəyirdəkli meyvə bitkilərinin becərilməsi ilə məşğul olmuşlar. Çəyirdəkli meyvə bitkiləri bu bölgənin xarici mühit şəraitinə xüsusi tələbləri ilə fərqlənirlər. Bu qrupun nümayəndələri şaxtaya nisbətən davamlı bitkilərdir. Bəzi nümayəndələri 30°C-yə qədər şaxtaya davam gətirə bilir. Əksər nümayəndələri, o cümlədən şaftalı bitkisi üçün kritik mənfi temperatur $16^0$-22°C-dir. Şaftalı bitkisi tez boy atır, məhsula tez düşür və hər il məhsul verir. Dünya miqyasında bütün qitələrdə becərilir.

Şaftalı meyvələri təzə halda yeyilməklə yanaşı, eyni zamanda müxtəlif emal məhsullarının - kompot, mürəbbə, cem, povidlo, şirə, qax hazırlanmasında da istifadə olunur. Meyvələrinin tərkibində 5, 49-15, 2% şəkərlər, 0, 12-1, 84% pektin, 1,11-4, 81% sellüloza, 12, 5-20 mq % "C" vitamini, duzlar vardır. Ləpəsində 4,84-56, 48 % yağ vardır. Bu yağdan xalq təsərrüfatında müxtəlif məqsədlər üçün istifadə edilir.

Şaftalı bitkisi (*Prúnus pérsica*) gülçiçəklilər fəsiləsinin, gavalıkimilər yarımfəsiləsinin, gavalı cinsindən olan bitki növüdür.

Şaftalı bitkisinin müasir təsnifatına görə iki və ya üç növünü fərqləndirirlər:

- *Prunus persica var. persica* (L.) BATSCH-adi şaftalı, ondan da *Prunus persica f. compressa* (LOUDON) RENDER- növü ayrılır;
- *Prunus persicavar. nucipersica* (SUCKOW) C.SCHNEIDER-nektarin;
- *Prunus persica var. potaninii* BATALIN (sinonim: *Amygdalus potaninii* (BATALIN) YU)-şaftalı Potanina və ya badam Potanina (1, 3).

Şaftalı bitkisinin vətəni haqqında müxtəlif fikir və yanaşmalar mövcuddur. Ehtimal olunur ki, Şimali Çində (Pekinin yaxınlığında) rast gəlinən *Prunus davidiana FRANCH* növü mədəni şaftalının ya yabanı formasıdır, ya da mədəni formasına çox yaxındır. Romalılar şaftalıya Acem alması (*Malus Persica*) deyirdilər. Şaftalı qədim Roma məlumatlarına görə 2000 il əvvəl Çində yetişdirilmişdir. Çin dilində şaftalı mənasını verən "Tao" sözü e.ə. 5-ci əsrin Çin əsərlərində rast gəlinirdi. Çində yabanı halda bitən bu bitkinin mədəniləşdirilməsi də çinlilər tərəfindən aparılmışdır. Müxtəlif mənbələrdə qeyd olunur ki, şaftalı bitkisi dünyaya Çindən yayılmış və uzun həyat və ölümsüzlük simvolu olaraq Çin sənətkarlığında qab-qacaq və farfor dekorasiyasında istifadə edilmişdir.

Çində şaftalının De Kaizn (De Caisne) tərəfindən müəyyən edilmiş yalnız üç forması *Vulgaris* (şaftalı), *Laevis* (tüksüz şaftalı nektarinlər) və *Piatycarpa* (pomidor şaftalı) geniş yayılmışdır. İsti iqlim qurşaqlarında yaxşı inkişaf edən şaftalı bitkisi Avropaya İrandan ispanlar tərəfindən gətirilmiştir (2, 4).

Belə ki, şaftalı, Orta Asiyanın yüksək dağları və köç yolları vasitəsilə Buxara, Kəşmir və İrana gətirilmiş və oradan Anadolu vasitəsilə Avropaya yayılmışdır. Yunanıstana və Romaya yayılması Milad tarixinin başlanğıcı ilə üst-üstə düşür. Qeyd olunan tarixlərdə Fransa və İtaliyaya da gətirilmişdir. 1600-cü ildən etibarən Fransada şaftalı bitkisinin seleksiya yolu ilə yeni sortları əldə edilmişdir.

Şaftalı bitkisi Cənubi Avropadan İngiltərəyə gətirilmiş və XVI əsrdə Oqustin şəhərində məskunlaşan İspan müstəmləkəçiləri tərəfindən Amerikaya aparılmışdır. Şaftalı qərblilər tərəfindən Amerikanın qərbinə qədər yayılmışdır. İngilis müstəmləkəçiləri Virciniyaya gəldikləri zaman Filadelfiyaya qədər olan bölgələrdə yabanı şaftalıya rast gəlmişlər və bu vəziyyət onları təəccübləndirərək özlərinin şaftalının vətənində olduqları təsirini bağışlamışdır. ABŞ-da sənaye məqsədi üçün şaftalı bitkisinin becərilməsinə 19-cu əsrdən sonra başlanılmışdır.

Bəzi mənbələrdə şaftalı bitkisini ilk dəfə İranda becərilməsi haqqında məlumat verilmişdir ki, bu da

bitkinin botaniki adı *(Prunus persica L.)* ilə əlaqədardır. Lakin 1885-ci ildə De Kandol (A.P. de Condolle) apardığı araşdırmalar nəticəsində bunun doğru olmadığını müəyyən etmişdir. Aparılmış arxeoloji və tarixi sübutlar nəticəsində müəyyən edilmişdir ki, ilk dəfə şaftalı bitkisi Çindən dünyaya yayılmışdır. Belə ki, 26 noyabr 2015-ci il tarixdə Təbiət Elmi Hesabatlarında (*Nature Scientific Reports*) nəşr olunan məqalədə qeyd olunur ki, şaftalının vətəni Çindir. Çinin Yunnan bölgəsində Kunmingdə bir yol qəzası nəticəsində ortaya çıxan qaya layları arasında səkkiz ədəd fosilləşmiş şaftalı çəyirdəyi tapılmışdır. Laboratoriya şəraitində kompüter tomoqrafiyası (KT) və elektron mikroskopu ilə aparılan araşdırmaya əsasən, şaftalı toxumlarının tarixi eramızdan əvvəlki dövrlərə təsadüf etdiyi müəyyən olunmuşdur. Bu dövr, dik yeriyən ilk insan növü olan Homo Erectus və müasir insanın (Homo Sapiens) yaranması dövründən daha çox əvvəlki bir dövrü əhatə edir. Bu çəyirdəklər müasir şaftalının bəzi növlərinin çəyirdəkləri ilə çox oxşar xüsusiyyətlərə malik olmaqla şaftalının təbii və süni şəkildə bugünkü müxtəlifliyə sahib olması üçün seçim aparıldığı ehtimal olunurdu (2, 3, 4).

Şaftalı bitkisi badam bitkisinə çox oxayır, lakin yalnız meyvəsinə görə ondan fərqlənir. Yarpaqlarının kənarları dişli lansetvaridir. Çiçəkləri çəhrayı və qırmızı rəngli olmaqla oturaqdır. Meyvəsi yastı və uzun ellips formada olub, bir tərəfində paz formasında şırım vardır. Meyvəsinin üstü məxməri örtüklə (tüklə) örtülüdür. Çəyirdəyi (endokarp) nöqtəli batıqlara malikdir.

Şaftalı meyvələrinin ləti orqanizm üçün faydalı olmaqla yanaşı alma, limon, sirkə, kinə turşuları, kalium, dəmir, fosfor, manqan, mis, sink, selen və maqnezium mineral duzları, C, E, K, PP, karotin, B qrupu vitaminləri, pektinlər və efir yağları, çəyirdəklərində acı badam yağı və amiqdalin kimi müxtəlif maddələrlə zəngindir (2, 4).

Nektarin (*Prunus persica var. nucipersica*) - adi şaftalının yarımnövü olub, meyvələri gavalı bitkisindəki kimi hamar qabığa malikdir. İngilis mənbələrində "nektarin" sözü 1616-cı ildən məlumdur. XX əsrin sonlarında sarı lətli, irimeyvəli (2000-ci ilə qədər) sortları yaranandan sonra nektarinlər çox geniş yayılmışdır. Nektarin bitkisinin meyvələri A və C vitaminləri ilə zəngindir.

Aralıq Dənizi ölkələrində daha çox istehsal olunur (Keçmiş Yuqoslaviya, İtaliya, İsrail, Kipr, Yunanıstan, Tunis). Bu bitki şaxtaya, xəstəliklərə və zərərvericilərə qarşı adi şaftalıdan daha çox davamlıdır. Belə ki, nektarin Şimali Qafqazda və hətta Volqoqrad vilayətində geniş sahələrdə yetişdirilir və onun soyuğadavamlı sortları mövcuddur (1, 3).

Şaftalı bitkisinin becərilmə texnologiyasının nisbətən asan, böyümə və inkişafı üçün çox yüksək aqrotexniki tədbirlər tələb etməyən, yüksək məhsuldar və rentabelli bitki olmasını, eləcə də bu bitkiyə, xüsusilə onun nektarin qrupuna daxil olan sortlarına artan tələbatı nəzərə alaraq Meyvəçilik və Çayçılıq Elmi-Tədqiqat İnstitutu (MÇETİ) tərəfindən 2016-cı ildə İspaniyanın "Viveros Veron" şirkəti ilə bağlanmış elmi əməkdaşlıq müqaviləsinə əsasən 2017-ci ilin mart ayında şaftalı və nektarinin 19 yeni sortu ölkəmizə gətirilmiş və onların sınağı üzrə tədqiqat işlərinə başlanılmışdır.

**Tədqiqatın materialı və metodikası**. Tədqiqat işi 2017-ci ilin mart ayında, 5x3 m əkin sxemində, institutun Zərdabi adına ETB-da 0, 15 ha sahədə ispan texnologiyası ilə əkilmiş, ümumi sayı 114 ədəd olan 19 şaftalı və nektarin sortları üzərində yerinə yetirilir. Müşahidə altında Meloks 26 (Melox), Meloks 31 (Melox 31), Meloks 37 (Melox 37), Netiks 25 (Netix 25), Netiks 28 (Netix 28), Netiks 30 (Netix 30), Netiks 34 (Netix 34), Rediks 25 (Redix 25), Rediks 27 (Redix 27), Rediks 30 (Redix 30), Rediks 2-110 (Redix 2-110), Maliks 25 (Malix 25), Maliks 36 (Malix 36), Maliks 145 (Malix 145), Guayoks 30 (Guayox 30), Guayoks 35 (Guayox 35), Apriks 116 (Aprix 116), Gartiro (**Gartairo),** Garteda Fikri sortlarıdır. Tədqiqat işləri bağçılıq üzrə ümumi qəbul olunmuş metodikalar əsasında həyata keçirilir. 2017-ci ildə əkilmiş ağaclara ispan texnologiyasına əsasən forma verilmiş, sahədə tam bitiş əldə edilmiş və ağacların ümumi vəziyyəti çox yaxşıdır. Bitkilər üzərində müvafiq müşahidə və ölçü işləri aparılmışdır. Aşağıda yeni introduksiya olunmuş şaftalı və nektarin bitkisinin bəzi sortları haqqında məlumat veririk.



**Meloks 26 (Melox 26).** Ağacları orta boylu, orta çiçəkləyən sortdur. Meyvəsi yumru və məxməri örtüyə malikdir. AA-AAA (73-80 mm və 80-90 mm) kalibrli ölçüsünə görə digər sortlardan fərqlənir. Meyvəsi 100% nara oxşar qırmızı rəngli olmaqla yanaşı şirin dad xüsusiyyətlərinə malikdir. Məhsul yığımı iyulun birinci ongünlüyünə təsadüf edir. Meyvələrin seyrəltmə dərəcəsi orta-aşağıdır. Sortun məhsuldarlığını artırmaq və ağacın güclü budaqlanması üçün yüngül budama aparmaq lazımdır.



**Meloks 31 (Melox 31).** Ağacları orta boylu, yüksək aqrotekniki tədbirlər tələb etmir. Yüksək məhsuldarlığına, meyvələrinin ölçülərinə və xarici görünüşünə görə digər sortlardan fərqlənir. Orta çiçəkləyəndir**.** Şaftalının ağ lətli bu sortu demək olar ki, tük örtüyünə malik deyil. Meyvələr ətirli və şirin dada malikdir. Meyvələrini uzun müddət ağacda

saxlamaq məsləhətdir. Meyvələrin kalibri AA+ (73-80 mm və daha böyük) olmaqla, 100% nara oxşar qırmızı rənglidir. Meyvələrin seyrəltmə intensivliyi orta aşağıdır. Məhsul yığımı avqustun birinci ongünlüyünə təsadüf edir.

**Meloks 37 (Melox 37).** Ağacları orta boylu, yüksək aqrotekniki tədbirlər tələb etmir, orta–gec çiçəkləyəndir. Meyvəsi məxməri, demək olar ki, tük örtüyünə malik deyil, 90% nar qırmızı rəngli və çox xoşagəlimli xarici görünüşə malikdir. Meyvə yığımı ən gec sentyabrın axırı - Gledis sortundan gec olmasına görə fərqlənir. Meyvələr ətirli və şirin dada malikdir. Kalibri AA (73-80 mm) olmaqla meyvələrin seyrəltmə intensivliyi orta-aşağıdır.





**Netiks 25 (Netix 25).** Ağacları orta boyludur. Çiçəkləməsi Big Top (martın ortalarından aprelin sonunadək) sortundan 4 gün əvvələ təsadüf edir. Meyvələri çox gözəl, yumru, 100% parlaq-qırmızı rəngli və parlaq qabığa, xırçıldayan, ağızda əriyən, ətirli və şirin dada malikdir. Kalibri A-AA (61-67 mm və 67-80 mm) olmaqla meyvələrin seyrəltmə intensivliyi ortadır. Məhsul yığımı Big Bang sortu ilə eyni olmaqla iyunun ortalarını əhatə edir.

**Netiks 28 (Netix 28).** Ağacları orta boylu, çiçəkləməsi Big Top sortu ilə eyni olmaqla martın ortalarından başlayır. Sortun meyvələri çox cəlbedici olmaqla yüksək məhsuldarlığa malikdir. Meyvələri 100% parlaq-qırmızı rəngli, yumru formalı, ağızda əriyən, şirin, ətirli və xırçıldayan struktura malikdir. Meyvələrin seyrəltmə intensivliyi orta-aşağıdır. Kalibri AA (73-80 mm) təşkil edir. Məhsul yığımı Daymond Ray sortu ilə eyni vaxtda olmaqla iyulun axırlarına təsadüf edir.





**Netiks 30 (Netix 30).** Ağacları orta boylu, orta çiçəkləyən olmaqla, yüksək məhsuldarlığa malik sortlardan biridir. Ağacda bir müddət saxlamaqla daha böyük kalibrlərə malik meyvələr əldə etmək olar. AA (73-80 mm) kalibrlidir. Meyvə bərk lətlidir və ağacda möhkəm qalır. Şirin ətrə və xırçıldayan struktura malikdir. Məhsul yığımı avqustun əvvəllərinə təsadüf edir. Meyvələrin seyrəltmə intensivliyi ortadır. Meyvələrinin rəngi 100% qırmızıdır.

**Rediks 25 (Redix 25).** Ağacları orta hündür, yüksək aqrotekniki tədbirlər tələb etməyən, çiçəkləmə Big Top (martın ortaları) sortundan 4 gün sonra. Ağ lətli, yüksək məhsuldarlığa, iri ölçülü meyvələrə malik nektarin sortudur. Meyvənin ölçüsü 73-75 mm-ə çatmaqla AA-A (67-80 mm və 61-67 mm) kalibrli və məhsuldarlıq 30.000 kq/ha təşkil edir. Meyvə gözəl xarici görünüş, oval forma, nazik qabıq və 100 % nara oxşar qırmızı və parlaq rəngə malikdir. Meyvə şirəli, ətirlidir və xoşagəlimli dada malikdir. Məhsul yığımı Big Bang sortundan sonra olmaqla meyvələrin seyrəltmə intensivliyi ortadır.





**Rediks 30 (Redix 30).** Ağacları orta hündürlüyə malikdir, yüksək aqrotekniki tədbirlər tələb etmir, orta çiçəkləyəndir. Bu sort meyvə xüsusiyyətlərinə görə fərqlənir. Belə ki, meyvələr xalsız olmaqla 100% tünd-nar qırmızı və parlaq rənglidir. AA (73-80 mm) kalibrlidir. Meyvələr strukturuna görə bərkdir və bu xüsusiyyət məhsul yığımını tələsik aparmamağa imkan verir. Ətirli və şirin xarakterik dada malikdir. Məhsul yığımı avqustun birinci həftəsinə təsadüf etməklə meyvələrin seyrəltmə intensivliyi ortadır.

**Rediks 2-110 (Redix 2-110).** **Ağac**ları şaquli formalı, çox məhsuldar, yüksək aqrotekniki tədbirlər tələb etmir, orta-gec **çiçəkləyən**dir. Bu sort parlaq və parçalanmayan qabığı və 100% bordo çalarlı rəngi ilə fərlənir. Meyvələri ətirli və şirin, kalibri AA (73-80 mm) olmaqla çox keyfiyyətli və davamlıdır. Ağızda xırçıldayır və ağacda daha çox qala bilir. Məhsul yığımı 18 avqust tarixinə Redix 30-dan 15-20 gün sonraya təsadüf edir. Meyvələrin seyrəltmə intensivliyi ortadır.





**Maliks 36 (Malix 36).** Ağacları orta boylu, yüksək aqrotekniki tədbirlər tələb etmir, orta-gec çiçəkləyəndir**.** Meyvələrinin xarici görünüşü Tardibel sortundan rəngi daha dolğun olması ilə fərqlənir, forması tam dairəvidir. Dadı şirin və ətirlidir. 100% çəhrayı çalarlı parlaq-qırmızı rənglidir. Yüksək

məhsuldarlığa və iri AA (73-80 mm) kalibrli meyvələrə malikdir. Sortun xüsusiyyətləri onun davamlılığı və meyvələrin standart ölçülü olması nəticəsində bu sortun yığımı qruplaşdırıla və adi rejimdə aparıla bilər. Məhsul yığımı sentyabrın birinci həftəsi və Tardibel sortunun məhsul yığımından 4 gün əvvəl olmaqla, meyvələrin seyrəltmə intensivliyi orta-aşağıdır.



**Guayoks 30 (Guayox 30).** Ağacları orta boylu, yüksək aqrotekniki tədbirlər tələb etmir. Meyvələri gözəl xarici görünüşə malikdir, tam dairəvi formalı və praktiki olaraq tüksüzdür. Bu sortun dişiciyi möhkəm və çatlarsız olur. Kalibri AA (73-80 mm) olmaqla 100% parlaq-qırmızı rənglidir. Xarakterik şirin dada malikdir və şirəlidir. Məhsul yığımı 7 və 5 gün Svit Kap (avqustun əvvəli) sortunun yığım tarixindən əvvəldir. Meyvələrin seyrəltmə intensivliyi ortadır.



**Guayoks 35 (Guayox 35).** Ağacları orta boylu, yüksək aqrotekniki tədbirlər tələb etmir, orta-gec çiçəkləyəndir. Meyvələri özünün yüksək məhsuldarlığı və iri AAA-AA (80-90 mm və 73-80 mm) kalibrli olması ilə fərqlənir. Bundan əlavə gözəl xarici görünüş, tam dairəvi forma, 100% nara oxşar qırmızı rəngə malikdir və praktiki olaraq tüksüzdür. Çox şirəli və şirin dada malikdir. Məhsul yığımı avqustun sonu Svit Kap sortundan 20-25 gün sonradır. Meyvələrin seyrəltmə intensivliyi ortadır.

**Garteda Fikri.** Ağacları güclü və olduqca məhsuldardır. Çiçəkləməsi Big top (martın əvvəlləri aprelin sonu) sortundan 4 gün əvvəl olmaqla çiçək sıxlığı və səmərəliliyi çox yaxşıdır. **Meyvələrin forması dəyirmi və ləkəsizdir. Ləti sarı və çox sərtdir. Uzun müddət ağacda qala bilər. Meyvənin rəngi tünd qırmızı və bir az ləkəlidir. Ətirli, turşusuz, çox şirin dada malikdir. Meyvə çəkisi 180-220 qr olmaqla** A (70-76 mm) kalibrlidir**.** Çəyirdək çatlaması yoxdur. Meyvə yığımı 10-15 iyun tarixlərini əhatə edir.



**Gartiro (Gartairo).** Ağacları güclü və olduqca məhsuldardır. Tez çiçəkləyən, çiçək sıxlığı və səmərəliliyi çox yaxşıdır. Meyvələri sarı lətli, oval formalı və çox sərtdir. Bu səbəbdən də budaqda çox qala bilir. Rəngi tamamilə tünd qırmızı və ləkəsizdir. Meyvənin çəkisi 170-220 qr olmaqla A (73-80 mm) kalibrlidir**.** Asitsiz və çox dadlıdır. Çəyirdək çatlaması yoxdur. Meyvə yığımı 1-5 iyun tarixlərini əhatə edir.



**Apriks 116 (Aprix 116).** Hər il çox yaxşı məhsuldarlığa malik ərik sortudur. Ağacları bir qədər dik, yüksək aqrotekniki tədbirlər tələb etmir ki, keyfiyyətli məhsul istehsalına imkan verir. Çox gec çiçəkləyə sortdur. Meyvələri gözəl, məxməri (tüklü), yumru formaya malikdir. Meyvələrin kalibri AAA (80-90 mm), rəngi 50 - 75% qırmızı-çəhrayı olmaqla parlaqdır. Meyvə tam yetişdiyi zaman əla dad keyfiyyətlərinə malik olmaqla, şirin tamlı və ətirlidir. Meyvə yığımı iyun ayının əvvəlinə, Kioto sortundan əvvələ təsadüf edir.



**ƏDƏBIYYAT**

1. Həsənov Z.M., Əliyev C.M.- Meyvəçilik, Bakı, 2011, 519 s. 2. Günseli Bayram. Şeftalinin kökeni, Türkiyə, 2015, https://www.evrensel.net/yazi/754 57/seftalinin-kokeni 3.https://ru.wikipedia.org/wiki/ 4. LaRue, J. H., 1989. Inrtoduction. Peaches, Plums, and Nectarines: Growing and Handling for Fresh Market (Eds. J.H.LaRue and R.S. Johnson). *University of California, Division of Agriculture and Natural Resources, USA, Publication 3331, pp: 1-2.*

**Новые интродуцированные сорта персиков**

**З.Ф.Сархадова**

В статье приведены данные о культуре персика, ареал его распространения и разновидностях, дана информация о сортов персика из группы нектаринов интродукцированных в нашу страну из Испании в 2017 году, а также помологическое описание этих сортов.

***Ключевые слова:*** *персик, сорта персиков, интродукцированные сорта, описание сортов.*

**The new introduced peach varieties**

**Z.F.Sarkhadova**

In the article peach plant, area of spreading and information about the varieties of peach and from Spain in 2017 introduced its nectarine group introduced, as well as a pomological description of these varieties.

***Key words:*** *peach plant, peach varieties, introduced varieties, features varieties.*

*mceti1926@gmail.com*